# Development sustainability phenomenon: theoretical interpretation

**Vugar Bayramov**
Leading research fellow, doctor of Philosophy in Economics,
Associate Professor, Institute of Economics of ANAS, Azerbaijan.
E-mail: bayramov.vuqar@gmail.com
https://orcid.org/0000-0001-5593-5530

**Abstract.** The article deals with the problem of sustainable development, its interpretation from various aspects and concepts of sustainable development. Thus, the problem of sustainable development is one of the most important issues of vital importance. At the same time, there are no one-time solutions to this problem. In other words, the problem, as an integral attribute of the process of economic development, has an extremely complex structure. First of all, it should be noted that the term "sustainable development" (in Azerbaijan, the term "sustainable" is often used. Sometimes both terms are used in the same sequence) is a translation from a foreign language. However, in a foreign language (English, French, German) the meaning of this expression has a broader meaning. For example, the English word "sustainable" means both sustainable and viable, environmentally rational, meeting future needs, and "development" means not only development, but also growth, improvement, evolution, production, and so on. contains. The same situation is in other foreign languages (German, French). The translation of the expression into Azerbaijani is extremely narrow. Even to the extent that at some point there is a perception that there is a logical contradiction in this style of expression. Indeed, "sustainability" is understood as equilibrium, but "development" as a process means "out of balance" as imbalance. However, the inadequacy of the style of expression should not be understood in the sense of a contradiction of concepts. Thus, 40 years ago, ecologists recommended that "sustainability" be applied to the economy as a whole, that is, to be understood as a "sustainable state of the economy" (in balance with ecosystems). This idea became more popular in the following periods, and concrete approaches to the sustainable development of ecosystems and eco-development were put forward.
**Keywords:** economic development, sustainability, sustainable development, concept, economic approach, social approach, global socio-natural environment, security.

**JEL** O110, O111, A110, B440; **UDC** 338.1:330.34/.35:338.12:330.34
**To cite this article:** Bayramov V. (2021). Development sustainability phenomenon: theoretical interpretation. *Economic Growth and Social Welfare*, Issue II, pp. 67-80.
**Article history:** Received – 19.03.2021; Accepted – 25.06.2021.

# İnkişafin dayanıqlılığı fenomeni: nəzəri interpretasiya

**Vüqar Bayramov**
aparıcı elmi işçi, iqtisad üzrə fəlsəfə doktoru, dosent,
AMEA İqtisadiyyat İnstitutu, Azərbaycan.
E-mail: bayramov.vuqar@gmail.com
https://orcid.org/0000-0001-5593-5530

**Annotasiya.** Məqalədə inkişafın dayanıqlılığı problemi, onun müxtəlif aspektlərdən interpretasiyası və dayanıqlı inkişaf konsepsiyaları haqqında mülahizələr öz yerini almışdır. Belə ki, inkişafın dayanıqlılığı problemi – həyati əhəmiyyət kəsb edən problemlər sırasında ön yerlərin birini tutur. Eyni zamanda, sözügedən problemin birdəfəlik həll üsülları mövcud deyildir. Başqa sözlə, problem – iqtisadi inkişaf prosesinin ayrılmaz atributu olaraq, son dərəcə mürəkkəb quruluşa malikdir. Hər şeydən əvvəl, qeyd etmək lazımdır ki, “dayanıqlı inkişaf” ifadəsi (Azərbaycanda bir çox hallarda “davamlı” ifadəsi işlədilir. Bəzən isə hər iki ifadə eyni ardıcıllıqla istifadə olunur) xarici dildən tərcümə olunmuş ifadədir. Lakin xarici dildə (ingilis, fransız, alman) bu ifadənin mənatutumu daha geniş anlamı əhatə edir. Məsələn, ingilis dilində “sustainable” ifadəsi – həm dayanıqlı, həm də həyatqabiliyyətli, ekoloji cəhətdən rasional, gələcək tələbatları təmin edən anlamını, “development” isə təkcə inkişafı deyil, həmçinin artımı, təkmilləşməni, təkamülü, istehsalı və s. özündə ehtiva edir. Eyni situasiya digər xarici dillərdə də (alman, fransız) yer almaqdadır. Ifadənin Azərbaycan dilinə tərcüməsi ifrat dərəcədə dar çərçivəyə salınmışdır. Hətta, o dərəcədə ki, bəzi məqamlarda sözügedən ifadə tərzində məntiqi ziddiyyətin olduğu təsəvvürü yaranır. Həqiqətən də “dayanıqlıq” – tarazlıq mənasında anlaşılır, amma “inkişaf” – proses olmaq etibarı ilə “tarazlıqdan” çıxış – natarazlıq deməkdir. Amma ifadə tərzinin yetərsizliyi anlayışın ziddiyyətliliyi anlamında başa düşülməməlidir. Belə ki, hələ 40 il bundan qabaq ekoloqlar “dayanıqlılığın” bütövlükdə iqtisadiyyata aid edilməsini, yəni “iqtisadiyyatın dayanıqlı vəziyyəti” (ekoloji sistemlərlə tarazlıqda olması) kimi dərk edilməsini tövsiyə etmişlər. Bu ideya sonrakı dövrlərdə daha çox populyarlaşmağa başlamış, ekosistemin dayanıqlı inkişafı, ekoinkişaf yönümlü konkret yanaşmalar ortaya qoyulmuşdur.
**Açar sözlər**: iqtisadi inkişaf, dayanıqlılıq, dayanıqlı inkişaf, konsepsiya, iqtisadi yanaşma, sosial yanaşma, qlobal sosio-təbii mühit, təhlükəsizlik.

**JEL** O110, O111, A110, B440; **UDC** 338.1:330.34/.35:338.12:330.34
**Məqaləyə istinad:** Bayramov V. (2021). İnkişafin dayanıqlılığı fenomeni: nəzəri interpretasiya.*İqtisadi Artım və İctimai Rifah*, № 2, səh. 67-80.
**Məqalə tarixçəsi:** göndərilib – 19.03.2021; qəbul edilib – 25.06.2021.

## Giriş / *Introduction*

«Dayanıqlı inkişaf» anlayışının ilkin definisiyası Brundland komissiyası (1987-ci il) tərəfindən verilmişdir: «Dayanıqlı inkişaf – gələcək nəsillərin öz tələbatlarını ödəmə qabiliyyətini təhlükə altına qoymadan cari tələbatları (indiki zamanda) ödəyən inkişafdır.» (GPAR, 2005). Yəni, dayanıqlı inkişaf iki əsas anlayış üzərində formalaşır: Tələbat anlayışı və məhdudiyyətlər anlayışı.

Dayanıqlı inkişaf konsepsiyasının təkamül prosesini 3 mərhələyə ayırmaq olar: (Cilpin, 1990).

1. Başlanğıc mərhələ (1968 – 1971): elmin ekologiyalaşdırılması; "Roma klubu";
2. Siyasi mərhələ (1972-1992): konsepsiyanın populyarlaşması, beynəlxalq səviyyəli institutların qarşılıqlı təsirinin formalaşdırılması;
3. Sosial-iqtisadi problemlər mərhələsi (1992-ci ildən bugünə qədər): konsepsiya BMT, siyasətçilər və elmi ictimaiyyət tərəfindən qəbul edilir və bir növ ehkam səciyyəsi daşımağa başlayır. Məhz bu mərhələdə konsepsiyanın ideologiyası, yönümlüyü, vəzifə və məqsədləri tam şəkildə formalaşdırılır.

Növbəti illərdə "dayanıqlı inkişaf" konsepsiyası yeni redaksiyada verilir: ikilik (iqtisadiyyat, ekologiya) üçlüklə (iqtisadiyyat, sosial sfera – ekologiya) əvəz olunur.

1970-ci illərin əvvəllərində baş vermiş böhran ekoloji situasiya ilə bağlı böyük problemlərin olduğunu üzə çıxardı. Problemin insanların həyat keyfiyyətinə və rifahına əhəmiyyətli dərəcədə təsir etdiyi empirik araşdırmalarla sübuta yetirildi. Belə ki, məhz həmin dövrdə "dayanıqlı iqtisadi rifah indeksi"ni hesablayan tədqiqatçıların (Deyli Q., Kobb C.) aldığı nəticələrə görə İngiltərədə 40 il (1950–1990) ərzində adambaşına düşən ÜDM-in 230% artmasına baxmayaraq, adambaşına «dayanıqlı iqtisadi rifah» cəmi 3% yüksəlmişdir.

Dayanıqlı inkişaf konsepsiyası son 200 ildəki təkamül prosesinin məntiqi yekunu kimi formalaşmış ənənəvi iqtisadi inkişaf anlayışını kardinal şəkildə dəyişmişdir. Üç əsas prinsip – maksimum gəlir, maksimum istehlak və maksimum hakimiyyət (iqtisadi gücə sahiblənmə nöqteyi-nəzərindən) gələcək tələbatlarının ödənilməsi zəruriliyi ilə əvəz olunmuşdur. Bu aspektin önəmliliyi o qədər yüksəlmişdir ki, "dayanıqlı vəziyyətin iqtisadiyyatı" tipli konseptual baxışlar meydana çıxmış, sabit, tarazlı iqtisadiyyat artan, yüksələn iqtisadiyyatdan daha mühüm hesab edilməyə başlamışdır (Khudokomov, 2009).

## Əsas hissə / *Main Part*

### Ədəbiyyatların təhlili

Tədqiqatçıların bir qrupu dayanıqlı inkişafın ikili məzmuna (həm statik, həm də dinamik aspektdən) malik olduğu qənaətindədirlər:

1) Baş verən dəyişikliklər prosesinə adaptasiya olunma;
2) Tarazlığın qorunub saxlanması.

Tarazlıqla bağlı əvvəllər qeyd etmişik. Dinamikada olan iqtisadi sistem bir qayda olaraq, natarazdır. Tarazlıq – natarazlığın ani dəyişməsidir. «Ani» – çox qısa zaman intervalı deməkdir. Yəni tarazlıq – çılpaq abstraktisiyadan başqa bir məna daşımır. Sırf nəzəri «yaranışdır». Digər tərəfdən, adaptasiya – dayanıqlılığın mahiyyət açıqlanması kimi çıxış edə bilməz. Ona görə ki, dayanıqlı inkişaf – məqsədyönlü şəkildə hərəkət yolunu seçmiş inkişafdır. Bu mənada, iqtisadi prosesin gedişində meydana çıxan dəyişikliklər məhz dayanıqlılığın, dayanıqlı inkişafa keçidin doğurduğu dəyişikliklərdir: dayanıqlılığın təminatına yönələn və elə onun özünün (dayanıqlılığın) doğurduqlarıdır. Adaptasiya prosesi dayanıqlılığın qərarlaşması prosesidir… İndi belə alınır ki, dayanıqlılığın mahiyyəti həmin mahiyyətdən çıxış etməklə şərh olunur.

«Dayanıqlı iqtisadi inkişaf» anlayışının konseptual məzmununun interpretasiya müxtəlifliyi kifayət qədər çoxsaylı və genişdir:

– Gələcək nəsillərə münasibətdə ətraf mühitin potensialını azaltmayan industrial

inkişafdır;

– Təbii resursların konservasiyasına istinadla ekoloji nöqteyi-nəzərdən korrekt yolla iqtisadi artıma (ələlxüsus inkişaf etməkdə olan ölkələrdə) nail olma cəhdidir.

– Gələcək nəsillərin tələbatının ödənilməsi imkanlarına zərər vermədən cari tələbatları təmin edən inkişafdır (DOON, 2012).

Bəzi araşdırmalarda dayanıqlı inkişafın faktorlu modellərini fərqləndirirlər (Kuznets, 1966, s. 3-9).

1) Ənənəvi yanaşma: 3 amilli model – iqtisadi, sosial və ekoloji! Dayanıqlı inkişaf – əldə olunan harmoniyanın dəyişməz olaraq qalmasını (saxlanmasını) deyil, dəyişiklik prosesində cari və gələcək tələbatların ödənilməsi imkanlarını özündə ehtiva edir.

2) Dördamilli model: cəmiyyət, ətraf mühit, elm və texnika, iqtisadiyyat.

3) Beşamilli model: cəmiyyət, ətraf mühit, elm və texnika, iqtisadiyyat, institutlar;

Hal-hazırda, dayanıqlı inkişafın 50-dən çox tərifi var (Abbasov, 1998, s.21). Eyni zamanda, tərif yaradıcılığı prosesi hələki, davam etməkdədir. A.Ursul haqlı olaraq göstərir ki: "...Təriflərin say artımı hələ davam edəcəkdir. Ona görə ki, prinsipcə qeyri-müəyyən və çoxvariantlı olan gələcək inkişafın dərk edilməsi prosesi davam etməkdədir." [Myurdal, 1972, s.30). Əksər yanaşmalarda ekoloji komponent dominantdır. Yəni, ictimai rifahın artımı = ekoloji effektivliyin artımı eyniyyəti əsas istinad nöqtəsi kimi götürülür. Amma, digər aspekt - ədalətlilik yalnız son zamanlarda aktuallaşdırılmışdır. Nəsillərarası, nəsildaxili və ekoloji ədalətlilik mahiyyətcə, ideala yaxın bir məna kəsb etməkdədir.

Dayanıqlı inkişafın ekoloji problemlərə cavab reaksiyası kimi ilkin müzakirəsi (beynəlxalq miqyasda) 1972-ci ilə təsadüf edir. Məhz həmin ildə Roma klubunun «Artımın sərhədləri» adlı məruzəsində belə bir təsbit ortalığa qoyuldu ki sənaye istehsalının artım templərinin olduğu kimi saxlanılması XX əsrin sonunda bəşəriyyəti məhv olmaq təhlükəsi ilə üz-üzə qoyacaqdır (Coleman, 1990).

Elə həmin ildə BMT-nin ətraf mühitə həsr edilmiş konfransında, ilk dəfə olaraq, «ekoiqtisadiyyat» anlayışı ön plana çıxarıldı. 1987-ci ildə dərc edilmiş «Bizim ümumi gələcəyimiz» adlı məruzədə «dayanıqlılıq», «dayanıqlı inkişafın» qacımazlığı əsaslandırılmışdır. Ekoloji problemin digərləri ilə – sosial, iqtisadi, siyasi və texniki – qarşılıqlı əlaqədə həll edilməsinin zəruriliyi ortalığa qoyuldu (ISEW, 1999).

L.Kolduell yazırdı ki: "...Ekoloji böhran ağıl və ruhi böhranın xarici təzahür formasıdır...Sual belə qoyulmalıdır: biz özümüzdə nəyi dəyişməliyik ki, yaşaya bilək?" (Waters, 1995).

Bu qəbildən olan yanaşmalar kifayət qədərdir.

- Siz planetin mühafizəsini müasir dövrün ən mühüm vəzifəsi hesab edrsiniz... Mən razı deyiləm. Həqiqətdə əsas olan çey – insanın maddi deqradasiyadan xilas edilməsidir.
- Ekoloji problem, hər şeydən əvvəl maddi yox, ruhi-mənəvi problemdir. Və, onun nüvəsində ətraf mühit deyil, insanın özü dayanıb" (Edracheva, Libman 2005, s.15-17).

V.Stepin fikrincə texnogen sivilizasiyanın doğurduğu və bəşəriyyətin mövcudluğunu şübhə altına salan çoxsaylı qlobal problemlərin sırasında aşağıdakılar daha önəmli yer tutur: (Kravchenko, 1982, s.30-31).

1) Kütləvi qırğın silahlarının fasiləsiz təkmilləşdirildiyi şəraitdə sağ qalmaq problemi;
2) Ekoloji böhranın qlobal miqyas alması;
3) Müasir antropoloji-böhran: yəni – insan böhranı."

Ümumiyyətlə, tədqiqatçıların böyük əksəriyyəti inkişafla bağlı böhranı, bəşəriyyətin bu günü və gələcəyi yönümündə yaranan böyük əndişələri ekoloji sfera ilə deyil, insanın özü ilə bağlayırlar. Bir sözlə, ekoloji böhran – dəyərlərin böhranıdır, insan varlığının "əsaslarının" böhranıdır, mənəvi-əxlaqi səciyyə daşıyan böhrandır.

BMT-nin analoji mövzuda keçirdiyi növbəti konfransda (1992, Rio de-Janeyro) iqtisadiyyat və ekologiyanın üzvi vəhdətdə olduğu qeyd edilmiş və bəşəriyyətin – «tərəqqi – məhdudiy-

yətsiz artımdır» (Kondrat'yev, 2004) təsbitindən uzaqlaşaraq yeni inkişaf modelinin tətbiqinə keçid üzrə ümumi razılığa gəlinmişdir. 2002-ci ildə keçirilən dünya sammitində əsas məqsəd dayanıqlı inkişafın maliyyələşdirilməsi mənbələrinin axtarışına həsr edilmişdir (Emil, Feser, 1999).

Ümumiyyətlə, sistemlər nəzəriyyəsinin əsas anlayışlarından olan «dayanıqlıq» – sistemin strukturu, davranışı və xarici (ətraf) aləmlə qarşılıqlı təsirinin optimallığını özündə ehtiva edən inteqral göstəricidir. Geniş spektrdən dayanıqlı inkişaf prosesini – ümumbəşəri sivilizasiyanın mövcudluq və inkişaf tipi kimi yozmaq olar. Bu qəbildən olan interpretasiyalarda, söhbət təkcə təbii-resurs potensialının rasional idarəedilməsindən deyil, bütün sosio-iqtisadi və sosio-mədəni sferalarda (mədəniyyət, ideologiya, dövlət institutları və s.) sistemli keyfiyyət dəyişikliklərindən gedir. (şək.1)

**Davamlı inkişafa nəzəri-metodoloji yanaşmalar**

Dayanıqlı inkişafın nəzəri metodoloji bazası hələ tam şəkildə formalaşmamışdır.

Bugün yalnız iki nəzəri yanaşma mövcuddur: (Kochetov, 1999).

1) Antropomərkəzçi yanaşma: inkişafın elementi insandır və proses onun idarəetməsi altındadır;

2) Biosfermərkəzçi yanaşma: insan bioloji varlıq kimi biosferanın vəziyyətindən asılıdır və onun qanunlarına tabe olur.

Əksər tədqiqatlarda ümumqəbul edilmiş baxışa görə, dayanıqlılıq – daxili və xarici mühitdə baş verən dəyişikliklərə və yaranan qeyri-müəyyənliyə münasibətdə sistemin ilkin vəziyyətinin qorunub saxlanması qabiliyyətidir. Sosio-iqtisadi sistemə münasibətdə bu cür müəyyənləşmə qəbul edilə bilməz. Bu qəbildən olan sistemlərdə əsas problemin ilkin situasiyanın qorunması deyil (həm mənasızdır, həm də prinsipcə mümkünsüz), inkişaf trayektoriyasının rəvan gedişinə nail olma istəyidir.

Digər tərəfdən, sosial-iqtisadi sistem həmişə - inkişaf, yaxud tənəzzül və ya durğunluq halında da dinamik səciyyə daşıyır. Bu mənada ilkin vəziyyətin sabit qalması, yaxud deyək ki, iqtisadi tarazlığın əbədiliyi mümkünsüz bir şeydir. İqtisadi proses – ayrı-ayrı zaman intervalında keçici və dəyişkən xarakterli sabitlik doğurur. Başqa sözlə, sabitlik – sosio-iqtisadi sistemin keyfiyyət xarakteristikasının xassələrindən biri kimi deyil, dayanıqlılığın zahiri görünüşlü törəməsi statusunu daşıyır.

Dayanıqlılıq fenomenini neoklassik yanaşma, məlum olduğu kimi, kamil rəqabət şəraitində bazar tarazlığına nail olma anlamında şərh edir. yəni inkişafın deyil, iqtisadi prosesin dayanıqlılığı araşdırılır və dayanıqlılıq tarazlıq prizmasından xarakterizə olunur. Aydındır ki, dayanıqlılıq = tarazlıq eyniyyəti yoxdur. Mahiyyətcə, fiksiya olan tarazlıq da, sabitlik kimi, dayanıqlılığın zahiri görünüşlü törəməsidir. Bu anlayışın geniş yayılmasının fikrimizcə, əsas səbəbi onun «görünən» hala gələ bilməsi, kəmiyyətcə qiymətləndirilməsinin mümkünlüyüdür. Amma inkişaf, həqiqətən, dayanıqlıdırmı? sualına yalnız proses başa çatdıqdan, yəni inkişaf-sistemli şəkildə qərarlaşdıqdan sonra cavab vermək mümkündür. Həm də, onun (dayanıqlılığın) zaman modusları arasında müqayisəsindən qeyri hər hansı bir ölçü proseduru yoxdur.

Təşkilat nəzəriyyəsində isə dayanıqlılıq yeni aspektlərlə «yüklənir»: kəmiyyət və strukturca dayanıqlılıq fərqləndirilir, müxtəlif səviyyəli sistemlərin dayanıqlılığı arasında nisbətin müəyyənləşdirilməsinə cəhd göstərilir. Qeyd olunur ki, sosio-iqtisadi sistemin dayanıqlılığı, onun elementlərinin deyil, həmin elementlər arasında formalaşmış əlaqələrin dayanıqlılığıdır. Yəni dayanıqlılıq – bir proses olma etibarı ilə tənzimlənə, idarə oluna bilər (Fei, Ranis,1981).

Problemə neoinstitutsional baxışa görə dayanıqlı inkişaf – gələcəkdə meydana çıxacaq qeyri-müəyyənliyin əhatə dairəsini azaltmaq məqsədi ilə sosio-iqtisadi sistemin elementləri arasındakı qarşılıqlı təsirin dayanıqlılığının təmin edilməsidir. İnstitutlar iqtisadi artımın dayanıqlılığının əsaslarını formalaşdırırlar, buna görə də institutsional mühit ilkin başlanğıcdan sistemin dayanıqlı inkişafının təminatına yönəlmişdir (Gelbreyt, 1979). Beləliklə, hesab edilir ki,

iqtisadi institutların dayanıqlılığı problemin mərkəzi məsələsidir. Yəni o, bir tərəfdən sosio-iqtisadi dinamikanı, digər tərəfdən isə dayanıqlı inkişafın əsas amili və sistem yaradan elementi keyfiyyətində çıxış edir. İqtisadiyyatın diversifikasiya dərəcəsinin yüksəkliyi və iqtisadi məkanın (ölkə daxilində) böyüklüyü iqtisadi sistemin dayanıqlılığı nöqteyi-nəzərindən mühüm rol oynayırlar. Lakin qeyd edilən yönümlü müsbət təsir müəyyən bir həddə qədər davam edə bilir. Yəni, təsir zamanca sərhədlidir. İnkişafın, yaxud iqtisadi artımın müəyyən mərhələsində sözügedən amillər iqtisadiyyatda «qapalılıq» effekti doğurmağa, dayanıqlılığın məzmun dəyişikliyinə (durğunluğun «dayanıqlılığı») səbəb olurlar.




**Şəkil 1. Dayanıqlı inkişaf konsepsiyasının tərkib elementləri.**
**Mənbə:** müəllif tərəfindən tərtib olunmuşdur

**Nəticələr və müzakirə**

Daha konkret və anlaşıqlı formada dayanıqlı inkişaf anlayışını ətraf mühit (təbiət) → sosio-iqtisadi effektivlik → ictimai rifah üçlüyünün vəhdəti kimi səciyyələndirmək olar. Yəni, ekoloji potensial yaxud imkanlar çərçivəsində rasional və ədalətli yaşayışın təminatı. Vurğu birmənalı olaraq həm ekoloji, həm də sosio-iqtisadi dayanıqlılığın üzərinə düşür. Ümumbəşəri səylərlə ekoloji tarazlığı qorumaq mümkündür. Bunun üçün, sadəcə olaraq təbii resurslardan rasional istifadə və tullantıların ləğv edilməsi kifayətdir. Lakin, həm ölkə daxilində, həm də ölkələrarası münasibətlərdə sosio-iqtisadi bərabərsizliyin meydana çıxardığı problemlər kompleksinin dağıdıcı təsirini aradan qaldırmaq, israfçılığı (istehlakda) dayandırmaq və iqtisadi imkanlar çərçivəsində yaşayışın təminatına, ədalətli yaşam standartlarının formalaşdırılmasına necə nail olmaq olar sualına konkret cavab vermək prinsipcə mümkünsüz görünür. Əlbəttə, ideallaşdırma metodundan yaralanmaqla hansısa bir formada məntiqi-nəzəri konstruksiya qurmaq olar. Və, bəşər tarixində qədim dövrlərdən utopistlərə və kommunistlərə qədər belə yanaşmalar mövcud olmuşdur. Lakin, bu qəbildən olan baxışların heç biri praktiki anlamda özünə yer ala bilməmişdir. Mahiyyət aspektindən yanaşdıqda, anlamamaq mümkün deyildir ki, insan üçün, onun rifahı və səadəti üçün həyata keçirilməsi zəruri olan dayanıqlı inkişafın başlıca maneəsi elə insanın özüdür.

Digər tərəfdən, əksər iqtisadi varlıqları əhatə edən çoxsaylı fluktuasiya prosesləri inkişafa münasibətdə «yeganə» amil yaxud "yeganə" mənbə axtarışını mənasızlaşdırır. Təsir gücündən asılı olmayaraq "yeganə" amillə inkişafı anlamaq mümkün deyildir.

«Dayanıqlı iqtisadi artımın» iqtisadi artımdan fərqli cəhətləri kimi aşağıdakıları önə çıxarırlar:

1. Artımın davamlılığı, yəni uzun müddət ərzində baş verməsi;
2. Artıma məqsəd kimi deyil, iqtisadi inkişafın strateji hədəflərinə çatma imkanı kimi baxılmalıdır;
3. Artımın fasiləsizliyi.

Məlumdur ki, iqtisadi proses tsiklik xarakter daşıyır. Bu mənada, aydın olmur ki, uzunmüddətlilik və fasiləsizlik hansı anlamda dərk edilməlidir. Fiziki zaman sərhədləri (bir ay, 1 il, 5 il, 10 il, və s.) hansı zaman kəsiyini ehtiva etməlidir?

Aydındır ki, iqtisadi inkişaf – dalğavarı xarakterlidir, sonludur, diskretdir. Tsikldə faza dəyişkənliyi təbii olaraq, uzunmüddətliliyin fiziki zaman ölçülərini mənasızlaşdırır. Bu rakursdan qeyd edilməlidir ki, dayanıqlılıq aspektindən uzunmüddətlilik yalnız tsiklin konkret fazasında deyil, bütövlükdə artım prosesinin dayanıqlı inkişafın strateji vektoruna adekvatlığı nöqteyi-nəzərindən qiymətləndirilməlidir. Yalnız bu halda iqtisadi artım dayanıqlılıq nümayiş etdirə bilər. Yəni, iqtisadi artımın "dayanıqlılığı" müstəqil bir kateqoriya olaraq dəyərləndirilməməlidir. O, yalnız inkişaf müstəvisində aydın konturları olan iqtisadi hərəkət kimi təcəssüm olunur. Qeyd etdiyimiz uyğunluq yeni yaranışlara, yeni keyfiyyət statusuna keçid prosesinin daxili məntiqinə uyğunluq deməkdir.

Bağlılıq o qədər güclü və üzvi xarakterlidir ki, bir çox hallarda dayanıqlı iqtisadi atımla dayanıqlı iqtisadi inkişaf anlayışları sinonim kimi işlədilir.

Əlbəttə, artımın kəmiyyət ölçülər mühüm əhəmiyyət kəsb edir. Amma… kəmiyyətcə artım keyfiyyət yenilənməsinə yönəlməyibsə, onda ümumiyyətlə, hər hansı bir dayanıqlıqdan bəhs etməyin mənası olmayacaqdır.

Məlumdur ki, iqtisadiyyatda və ümumiyyətlə, sosio-iqtisadi həyatda həm hadisələrə, həm də sistemin özünə baxış xolist paradiqma çərçivəsində həyata keçirilir. Həm hadisə, həm də sistem – bütövlük, tamlıq anlayışlarının prizmasından qəbul edilir. Bu halda hər bir obyekt sistemlilik keyfiyyətinə sahiblənir. Yaranmış vəziyyət (situasiya) prosesə qarşı qoyulmur, situasiya - tarazlıq anlamında dinamik məzmun kəsb edir. Prosessuallıq – universal xarakteristika statusuna yiyələnir. Eyni zamanda, nəzərə alınmalıdır ki sosio-iqtisadi sistemin tərkib ünsürləri də sistem keyfiyyətində çıxış edirlər. Tamlığı, bütövlüyü yaradan da məhz həmin sistemlər

çoxluğunun qarşılıqlı asılılıq və qarşılıqlı bağlılığıdır.




**Şəkil 2. Həyatın dayanıqlı inkişafının struktur elementləri.**
**Mənbə:** müəllif tərəfindən tərtib olunmuşdur

Bu aspektdən inkişafın dayanıqlılığı problemi sözügedən sistemlər çoxluğunun davranış tərzi ilə bahəm, mühitin məzmun tutumunun necəliyi ilə sıx bağlılıqda olur. Belə ki, hər hansı bir sistemə tam kimi baxılarsa, onda həmin sistemin fəaliyyətdə olduğu mühit mütləq formada diqqət mərkəzinə gətirilməlidir. Mühit – inkiişaf etmək qabiliyyətinə malik olan determinləşmiş məcmuluqdur. Mühit – potensial olaraq proseslərin müxtəlif formalı lokallaşmasını özündə ehtiva edir. Mühit –sözün müəyyən anlamında hansısa bir şəkildə vahid başlanğıc kimi çıxış etməklə, müxtəlif formalı gələcək yaranışların daşıyıcısı, inkişaf yollarının birmənalı olmayan sahəsi rolunu oynayır. Müasir sosio-iqtisadi gerçəkliyin daxili məntiqindən çıxış etdikdə isə məlum olur ki, mühit – müxtəlif «gələcəklər»dən hansının dominant mövqeyə keçəcəyini bəri başdan müəyyənləşdirmək imkanı verir.

Dayanıqlı inkişaf konsepsiyasının spesifik xüsusiyyətlərindən biri prosesin müxtəlif mərhələlərində digər inkişaf tiplərini (tərəqqi, tsiklik, dalğavari, neytral və s.) özündə ehtiva etmək iqtidarında olmasıdır. Bu xüsusiyyət konkret zaman-məkan kontiumu çərçivəsində sistemin tarazlığını təmin edir. Və, vaxtaşırı problemlər doğuran birölçülü – iqtisadi mərkəzçi yanaşmadan sığortalanmaq imkanı yaradır.

Dayanıqlılığa münasibətdə "təhlükəsizlik" fenomeninin qabardılması, bir tərəfdən, o anlama gəlir ki, ayrı-ayrı sferaların (sosial, iqtisadi, ekoloji, texnoloji və s.) təhlükəsizliyini təmin etmədən yaxud həmin sferalarda hərəkəti "normativ təhlükəsizlik" trayektoriyasına keçirmədən qlobal dayanıqlılığın sistemliliyinə nail olmaq olmaz. Digər tərəfdən, təhlükəsziliyin təmini hələ o anlama gəlmir ki, inkişaf dayanıqlı olacaqdır. Başqa sözlə, təhlükəsiz situasiyada baş verən inkişaf sosio-iqtisadi və sosiomədəni sistemlərdə, yəni bütövlükdə cəmiyyət miqyasında yeni keyfiyyət dəyişikliklərinə səbəb olmursa, onda o, nəinki dayanıqlı, heç ümumiyyətlə inkişaf deyil, ən yaxşı halda iqtisadi artımdır. Buna görə də strateji inkişaf konsepsiyası dayanıqlıq və təhlükəsizliyi ayrı-ayrı elementlər, ayrı-ayrı məqsədlər kimi deyil, üzvi bağlılıqda, vəhdətdə ehtiva etməlidir. Prosesin yekunu aspektindən bu birləşmə ilə bağlı elə bir "qaranlıq" məqam qalmır. Təhlükəszilik – dayanıqlılığın "məhsulu", həm də əsas şərtidir. Yəni, dayanıqlılıq – sistem təhlükəsizliyi doğuran və ona istinadla gerçəkləşən strategiyadır.




**Şəkil 3. İnkişaf və təhlükəsizlik ikiliyinin üzvi vəhdəti.**
**Mənbə:** müəllif tərəfindən tərtib olunmuşdur

Dayanıqlı inkişaf – təhlükəsiz inkişaf tipidir. "Təhlükə" adı altında əksər tədqiqatçılar ekoloji situasiyanın, ekosistemin "təsərrüfat tutumunu" qeyd edirlər. Lakin, "təhlükənin" yarana biləcəyi və ekoloji problemlərdən heç də az təhlükəli olmayan sosial sfera vardır. Bəşəriyyətin kiçik qismi – "qızıl milyard" – israfçılığın tüğyan etdiyi istehlakçı cəmiyyətdə yaşadığı halda, böyük qismi ən elementar tələbatlarını belə ödəməkdə çətinlik çəkirlər. Qlobal səviyyədə artıq formalaşmış "ədalətsizliyin" sərhədləri durmadan genişlənməkdədir... Qlobal dayanıqlılıq – sosial ədalətliliyin qərarlaşdığı zaman – məkan kontiumu çərçivəsində gerçəkləşə bilər.

Eyni zamanda, altını cızmaqla qeyd etmək lazımdır ki, dayanıqlı inkişaf – ayrıca götürülmüş bir ölkənin, bir milli iqtisadiyyatın öhdəsindən gələ biləcəyi bir strategiya deyildir. Qlobal situasiyanın dayanıqlılığına nail olmadan bu istiqamətdə real effekt əldə oluna bilməz. Bunun üçün ilkin olaraq qlobal səviyyədə sosio-təbii – iqtisadi proseslərin hüquqi tənzimlənməsi, hüquqi çərçivəsi (normalar, məhdudiyyət sistemi və s.) qurulmalı və əksər ölkələr tərəfindən bu qaydalara riayət edilməlidir. Əlbəttə, müasir dövrün spesifikası aspektində söylənənlər utopiya kimi səciyyələnir. Məhz həmin "utopiyanın" reallığa çevrilməsi nöqteyi-nəzərindən qlobal inteqrativ bağlılıqların formalaşması obyektiv zərurətə çevrilir.

Bütün təfərrüata varmadan da istehlakın sonsuzluğunu məhdudlaşdıran, konkret sərhədləri olan çərçivəyə salan əsas amilləri aşağıdakı ardıcıllıqla sıralaya bilərik:

1. İqtisadi inkişafın hüdudluluğu, tsiklik xarakter daşıması; Artım və tənəzzül dövrlərinin növbələşməsi istehlakın fasiləsiz olaraq yüksələn xəttlə artımını məhdudlaşdırır;
2. İnnovativ – texnoloji və informasiya sferalarındakı yüksəlişin təbii sərhədlərinin mövcudluğu;
3. Təbii resurslaırn tükənməsi;
4. Modernləşmə və qloballaşma proselərinin dünya ölkələrinin 2/3-dən çoxunu əhatə etməsi;
5. İndividual istehlakın zaman məhdudiyyəti;
6. Qlobal ekoloji situasiyanın pisləşməsi.

Müasir dövrdə sadalanan məhdudiyyətlərin təsir gücü o qədər də güclü hiss edilmir. Lakin, yaxın 20-30 il ərzində sadalananların qarşılıqlı bağlılıqda "hərəkətə" keçəcəyi və neqativ aspektli multiplikativ effekt doğuracağı hər cür şübhədən uzaqdır. Məsələn, artıq bu gün enerjidaşıyıcılarının satış qiyməti ilə Qlobal Məcmu Məhsulun artımı arasında konkret tərsmütənasib asılılıq formalaşmışdır. Belə ki, BVF-nun apardığı araşdırmalara görə neftin bir barrelinin satış qiymətinin 10 dol. yüksəlməsi QMM-u il ərzində 0,5% aşağı salır (Skorodumova, 2007).

Iqtisadi sistemin, əksər sistemlərə xas olan emergentliyi müasir qloballaşma prosesinin təsiri altında qlobal miqyasda təzahür etməklə daha geniş miqyaslı multiplikativ effekt doğurur. Və bu effekt – situasiyanın məzmunundan asılı olaraq həm mənfi, həm də müsbət səciyyə daşıya bilər.

Əlbəttə, dünya iqtisadiyyatında mövcud olan müsbət yönümlü təmayülləri (innovativ-texnoloji yeniləşmə, məhsuldarlığın artımı və s.) inkar etmək olmaz. Amma, narahatçılıq doğuran əsas məqam ondan ibarətdir ki, müsbət yönümlü təmayüllər yuxarıda sadaladığımız məhdudiyyətləri aradan qaldırmır. Əksinə, həmin məhdudiyyətlərin çərçivəsində dünya iqtisadiyyatının

permanent böhranlar silsiləsinə doğru hərəkətini daha da sürətləndirir.

Bir sıra tədqiqatlarda (A.Sen və s.) problemdən çıxış yolu kimi faydalılıq funksiyasının ön plana çıxarılmasının zəruriliyindən bəhs edilir. Başqa sözlə, istehlak sferasında kəmiyyət çoxalması öz yerini keyfiyyətə verir. Amma, qeyd edilən keçidə praktiki müstəvidə necə nail olunmalıdır sualı cavabsız buraxılır. Ümumiyyətlə, ideya təqdirəlayiqdir. Lakin, qlobal miqyasda rəqabət mübarizəsinin (keyfiyyət səviyyəsinin həlledici rol oynadığı) ifrat formada kəskinləşdiyi bir dövrdə keyfiyyətə keçidin əksər ölkələr arasında “bərabər” bölgüsünə nail olmaq, prinsipcə mümkünsüzdür. Bu, yalnız o halda baş verə bilər ki, əksər dünya ölkələri arasında inteqrativ bağlılıq (real məzmunlu) formalaşsın. Dünyanın ən böyük inteqrasiya qruplaşması olan Avropa İttifaqında baş verən mərkəzdən qaçma prosesi sözügedən bağlılığın yaxın gələcəkdə gerçəkləşmə ehtimalının olmadığını göstərir.

Sübut etməyə ehtiyac yoxdur ki, dayanıqlı inkişaf trayektoriyasına keçid, nəinki ayrı-ayrı ölkələrin, dünya iqtisadiyyatının, eləcə də bütövlükdə sivilizasiyanın strateji inkişaf prosesində inqilabi səciyyə daşıyan kardinal dəyişikliyin baş verməsi deməkdir. Uzun illərdir hökmran mövqedə olan nəzəri-konseptual baxışlar dünyanın, bəşəriyyətin gələcəyini “indi”nin mahiyyət çalarlarından çıxış etməklə təsvir edirdilər. Həmçinin, hesab olunurdu ki, “gələcək” mütləq gələcəkdir və nəyin bahasına olursa-olsun inkişaf prosesi davam edəcəkdir. Spontan şəkildə baş verən inkişaf prosesi, mövcudluq şərtlərinin öncüllüyü üzərində təbii axın formasında gedir. Hətta o dərəcədə ki, inkişaf – dünya iqtisadiyyatının qanunu kimi xarakterizə olunurdu. Ayrıca götürülmüş milli iqtisadiyyat prizmasından bu cür (nəzəriyyədə pozitiv yanaşma) yanaşmanın sanki alternativi yox imiş kimi davranılırdı. Əslində isə, belə bir yanaşma (normativ) vardı, lakin “nəyin bahasına olursa-olsun” fəlsəfəsinin çərçivəsinə sığmırdı.

Dayanıqlı inkişaf – normativ yanaşma üzərində qərarlaşa bilər. Yəni, həm resurslara, həm insanlara, həm də ekoloji mühitə münasibətdə konkret normalar və məhdudiyyətlər sistemi tətbiq olunur. Başqa sözlə, inkişafla bağlı sualın qoyuluşu dəyişir: “necə” sualı “necə olmalıdır” sualı ilə əvəzlənir. Və sadəcə bununla kifayətlənilmir. Dayanıqlılığın həm ölkə, həm də qlobal səviyyədə əsas strateji hədəfə çevrilməsi sosial elmlərdə, əlalxüsus iqtisadi nəzəriyyədə adekvat metodoloji dəyişilməni aktuallaşdırır.

Dayanıqlı inkişaf – konseptual anlamda “xalis” iqtisadi nəzəriyyə çərçivəsində dərk edilə bilməz. Onun metodoloji bazası – elmlərarası sintezə söykənir və eklektik səciyyə daşıyır. Bu anlamda, problemə sırf metodoloji prizmadan sinergetik yanaşmanın tətbiqi obyektiv zərurət halına gəlir.

İnkişaf – milli və qlobal sosiumun gələcəyini “quran” prosesdir. Onun spontan şəkildə yaxud öz “axarı” ilə gedişi, kəmiyyət ölçüsü olan göstəricilərin fasiləsiz artımı və s. “gələcəyi” qura bilməz, yaxud gələcəyin çoxvariantlığı şəraitində məhz hansı variantın gerçəkləşəcəyini müəyyənləşdirmək mümkün deyildir. Sosiumun daxilində gedən proseslərlə təbiətdəki prosesləri eyniləşdirmək, eyni məntiqlə yanaşmaq qəbul olunmazdır. Bəşəriyyət üçün mühüm olan dəyişikliyin (prosesdə) mövcudluq şərtləri deyil, mahiyyətidir.

M.Blauq yazırdı ki, “...iqtisadi sistemin “mahiyyəti” haqqında istənilən xatırlatma bizi narahat edir (Skorobogatov, 2008, s.265-279). Essensializmi tam əsasla taksonomaniyanın məntiqi ünsürü hesab etmək olar. “...Mahiyyət yanaşması”... – “naftalin iyi verən metoddur”. Bu yanaşma – kəmiyyət təhlili üçün “heç bir yer saxıamır”. “Dünənin neandertal essensializminə” dönüşə ehtiyac yoxdur. Fikir – çox aydın və səlis şəkildə ifadə olunubdur. Dayanıqlı inkişafa keçid yalnız mahiyyət üzərindən baş verə bilər. Digər tərəfdən, sirr deyil ki, mövcudluq şərtləri bir qayda olaraq, təsvirçiliklə, mahiyyət isə anlama metodikası bazasında şəhr edilir.

Mahiyyəti naməlum olan varlığın, hadisə yaxud prosesin dayanıqlığına keçid necə baş verə bilər ki? Qlobal dayanıqlılıq – bəşəriyyəti məhv olma təhlükəsindən xilas edə biləcək yeganə strateji hədəfdir. Və o, heç bir qeyd–şərtsiz “necə olmalıdır” sualına cavab verir. Yəni, normativ məzmunludur, konkret sərhədləri və hüdudları mövcuddur, tənzimlənən və idarəedilәndir...Və, bütün bunlar mahiyyətcə mövcud inkişaf paradiqmasının kardinal şəkildə dəyişdiyini ortalığa

qoyur.

Hesab edirik ki, dayanıqlı inkişaf konsepsiyasını olduğu kimi qəbul etmək və onun dəyər tutumunu həddindən artıq, konsepsiyanın daşıya biləcəyindən çox yükləmək yalnışlıq olardı. Əks-təqdirdə "ədalətli cəmiyyət tipi" axtaran utopistlərə, kommunizm cəmiyyəti qurmaq istəyənlərin "hər kəsdən qabiliyyətinə, hər kəsə tələbatına görə" prinsipinə və ümumiyyətlə, bu anlamda kifayətqədər "uzaqlara" gedib çıxmaq olar. Mental dəyərlərin (onların xüsusi önəm daşıdığını unutmamaq şərti ilə) cəlbedici "tələsinə" düşməməyin yolu konsepsiyanın elmi əsasda dəyərləndirilməsindən keçir. Dayanıqlılıq fenomeni mütləq deyil, nisbi anlayışdır. Yəni, konsepsiya çərçivəsində bəşəriyyətin (əgər qlobal həmrəyliyə nail oluna bilinərsə) əldə edə biləcəyi yeganə nəticə ətraf mühitin dağılması prosesinin minimal səviyyədə ləng gedişi və ədalətsizliyin kəskinlik dərəcəsinin qismən azaldılması olacaqdır. Hər hansı bir tədqiqat aparmadan da, təsbit etmək olar ki, təbii resurslar azalmadan iqtisadi inkişaf baş verə bilməz. Məsələn, neft və təbii qaz ehtuyatları – bu günkü istehlak səviyyəsi olduğu kimi qalarsa – birinci (neft) 42 ildən, ikinci (qaz) 71 ildən sonra tükənəcək. Həmçinin, yeni yataqların kəşf olunma ehtimalı da o qədər inandırıcı deyil. Bu azalma, hətta tükənmə deyilsə, bəs nədir? Digər tərəfdən, meşələrin kütləvi şəkildə qırılması ilə bağlı da bərpa etmə aspektindən birmənalılıq yoxdur. Yeni meşə massivinin yaranması üçün uzun dövr lazımdır. Bu dövrü milli iqtisadiyyatlar gözləmə rejimindəmi keçirməlidirlər? Yaxud, sosial ədalətlə bağlı problemin həlli yolları barəsində vahid bir yanaşma varmı? Fəlsəfə 5 konsepsiyadan söhbət açır. Və, sosial ədaləti – yalnız bölgü sferasına aid edirlər. Faktor gəlirlərinin bölgüsü hər bir faktorun sərf etdiyi "enerji" məsrəflərinə uyğun şəkildə aparılırsa və işsizlər kütləsi bu bölgüdən kənarda qalırsa, bunu ədalətsizlik adlandırmaq olmaz. Əgər kiminsə haqqı – haqq etdiyi qədər özünə çatırsa, buna ədalətsizlik demək olmaz axı! Faktor gəlirlərinin yenidən bölgüsü sferasında sosiumun bir qrupuna elementar yaşayış şəraiti yaradılırsa, bu da ədalətlilik deyil, xeyirxahlıqdır. Insana – insan olduğu üçün yardım etməkdir. Indi, dayanıqlı inkişaf – sosial ədaləti necə bərqərar etməlidir ki? Bölgüdə bərabərçilik prinsipinin tətbiqi iləmi? Sosial ədalətlilik – bir tərəfdən, ölkənin əksar vətəndaşları üçün start vəziyyətinin eyniliyi, bərabərliyi (məsələn, kredit resurslarına çıxış aspektindən), digər tərəfdən isə haqqın haqq sahibinə verilməsidir. Və, bunların ikisi də formal tələblərdir və hüquqi normalarla tam şəkildə tətbiq oluna bilər.

Təfsilata varmağımızın əsas səbəbi ondan ibarətdir ki, əvvəla, ədalətli cəmiyyət – hələ "ideal" cəmiyyət deyildir; ikincisi, ədalətli cəmiyyət dayanıqlı inkişafın şərti, amili yox, nəticəsidir. Ədalət → ekoloji tarazlıq → ictimai rifah (ümummilli rifah) üçlüyünün gedişi (dayanıqlı inkişaf çərçivəsində) hüquqi norma və məhdudiyyətlərin, yəni qanun qüvvəsi olan, qanuni statusu olan məhdudiyyət və qadağaların yaratdığı, tam nəzarət altında olan "koridordan" keçir. Dayanıqlılığın struktur əlaqələrinin genişliyini nəzərə alsaq, onda qeyd etdiyimiz "koridorun" çox dar olduğunu qəbul etməliyik. Başqa sözlə, dayanıqlılıq prizmasından məhdudlaşdırmaya ehtiyacı olan çox şey mövcuddur. O cümlədən, azadlıq! Belə bir aksiomatik təsbit vardır ki, azadlığın istənilən forma və məzmunda (söhbət, praktiki müstəvidə aparılan insan fəaliyyətinin azadlığından gedir) məhdudlaşdırılması iqtisadi effektivliyi azaldır və şəxsiyyətin formalaşma prosesinə mənfi təsir göstərir. Digər tərəfdən, məhdud azadlığın mövcud olduğu cəmiyyətdə sosial ədalət sözün tam mənasında qərarlaşa bilməz. Beləliklə, paradoksal situasiya yaranır.

İnsanların (vətəndaşların) yaxud ümumi şəkildə,individiumun seçim azadlığı (məqsədin necə olmasında asılı olmayaraq) məhdudlaşdırılır. Beynəlxalq yaxud milli səviyyəli müəyyən strukturlar çoxvariantlı gələcəyi birvaraintlı gələcəyə çevirir və bu çevirmədə sosium iştirak etmir. 1917-ci ildə bolşeviklərin etdiyi kimi! Və, əgər nəzərə alsaq ki, dayanıqlılıq fenomeni, öz mahiyyəti etibarı ilə yalnız qlobal miqyasda real formada gerçəkləşə bilər, onda seçim prosesi növbəti dəfə bugünki inkişaf paradiqmasını bəşəriyyətə qəbul etdirənlərin – Davos mədəniyyətli yeni Şimalın nəzarətində baş tutacaqdır. Daha doğrusu, baş tuta bilər: əgər sözügedən qruplaşma həqiqətən də dayanıqlılığa keçidin tərəfdarı olarsa!

Beləliklə, ümumbəşəri gələcəyin normal, ədalətli prinsiplər bazasında qurulması ehtimalı nöqteyi-nəzərindən dayanıqlılıq ideyası təqdirəlayiq ideyadır. Lakin, böyük problemlərin və ziddiyətli məqamların bolluğu ucbatından bu strategiyanın reallaşma ehtimalı elə ehtimal olaraq qalacaqdır!

## Nəticə / *Conclusion*

Dayanıqlı inkişaf trayektoriyasına keçid məqsədyönlü prosesdir və bu mənada bazar mexanizminin spontan təbiəti ilə təşkil edilə bilməz. Bazar kriteriyaları – bəşəri dəyərləri (ədalətlilik və s.) ehtiva etmir. Bu anlamda, «…Hətta ən effektiv bazar sistemi belə, kəskin bərabərsizlik yarada bilər» (Kashirin, 2019, s.19) və yaradır da! Dayanıqlı inkişaf şəraitinin formalaşdırılmasında əsas rol dövlətə aiddir. Dövlətin əsl təyinatı – iqtisadi artımın, sabitliyin və iqtisadi effektivliyin stimullaşdırılmasıdır (Kashirin, 2019, s.17). Başqa sözlə, bazar iqtisadiyyatı çərçivəsində dayanıqlı inkişafa keçid problemi, bütünlüklə dövlətin məsuliyyəti altındadır. Bu aspektdən, yəni dayanıqlılığın təminatı prizmasından dövlət→bazar cütlüyündə formalaşan qarşılıqlı münasibətlərin xarakteri həlledici əhəmiyyət kəsb edir. Aydındır ki, şüurlu elementin, yaxud subyektiv amilin spontan mexanizmə müdaxiləsi, daha doğrusu, bu müdaxilənin konseptual sərhədlərinin birmənalı şəkildə müəyyənləşdirilməsi imkansızlığı həm nəzəri-metodoloji, həm də praqmatik müstəvidə gerçək məzmun kəsb edir. Problemin dərkedilmə çətinliyi onunla bağlıdır ki, əvvəla, şüurlu element → spontan qayda ikiliyinin real mahiyyətdə adekvatlığını təmin etmək son dərəcə çətin bir məsələdir. Belə ki, spontanlıq kortəbiilik deyil, şüurlu elementin məqsədyönlü yanaşma olmadan doğurduğu mexanizmdir… «Görünməyən əl» – hər halda, subyektiv məzmunludur, subyektiv təsirdən kənarda deyildir. Bu mənada spontanlıq → şüurlu şəkildə formalaşdırılan məqsədyönlülüyün yoxluğudur; ikincisi, spontan mexanizmə müdaxilə, ölkədə formalaşmış bazarın məzmun tutumu, reallıq dərəcəsi və strukturundan asılı olaraq müxtəlif nəticələr, o cümlədən əks-nəticələr verə bilər. Bu mənada, müdaxilənin sərhədlərini (konseptual çərçivədə) müəyyənləşdirmə kriteriyası, yaxud kriteriyalar sistemi nələri özündə ehtiva etməlidir? sualı bu gün də açıq qalmaqdadır. Əgər insana, cəmiyyətə və təbiətə münasibətdə ədalətlilik kriteriyası önə çəkilirsə, bu iqtisadi azadlıqların qərarlaşma dərəcəsinin funksiyası kimi ortalığa qoyulmalıdır. Spontanlıq – iqtisadi azadlıqların yaratdığı mexanizmdir – əksinə deyil! Yəni müdaxilə, müdaxilə olunan mexanizmin mahiyyət çalarları üzərində qurulmalıdır. «Bazara – həzm edə biləcəyi qədər azadlıq verilsin» təsbiti isə sırf ideallaşma səciyyəsi daşıyır. Yaxud bazarın – söhbət abstraksiyadan, yaxud «Nəzəri bazardan» yox, konkret fəaliyyətdə olan ölkə bazarından gedir - «azadlıqtutumunun» həcmini empirik şəkildə qiymətləndirmək mümkünmü ki, onun konkret həcmini müəyyən edəsən? Beləliklə, dayanıqlılığın təminatı nöqteyi-nəzərindən təsir obyektinin ikiləşməsi baş verir: «Real bazar» → «nəzəri bazar». Birinci konkret, praqmatik fəaliyyət göstərəndir, ikincisi isə – abstraksiyadır.

Üçüncüsü, dayanıqlı inkişafa keçidin açar strukturları kimi dövlət → bazar qarşılaşdırılması, əslində (dayanıqlılıq fenomeninin bütövlükdə cəmiyyətə aidliyi …..) birtərəfli, birölçülü xarakter daşıyır. İkiliyin qarşılıqlı əlaqələri rakursundan sistemində «vasitəçi» olmalıdır. Bu anlamda, ikilik üçlüklə əvəz olunmalıdır: Dövlət → vətəndaş cəmiyyəti → bazar! «Vasitəçi» – vətəndaş cəmiyyəti – mənafe müxtəlifliyi ilə xarakterizə olunan strukturdur. Mənafelərin tarazlığı – dayanıqlı inkişafa keçidin əsas bazası rolunu oynaya bilər. Dövlət – milli mənafeni, vətəndaş cəmiyyəti – müxtəlif səpkili mənafeləri, bazar isə faydanı («simasız», anonim subyektin əldə etdiyi faydanı) əsas istinad nöqtəsi kimi götürür. Yəni, milli mənafe → struktur bölmələrin mənafeyi → «simasız» subyektin faydası üçlüyündə müdaxilənin effektivliyini təmin edəcək istiqamətlərin anatomik təsvirini vermə imkanı yaranır. Vahidlikdən (milli mənafe) çoxluğa keçid, çoxluğun sonsuz sayda təkçələrə transformasiyası və hər iki halda (keçid prosesində) rəvanlığın, sinxronluğun qorunması, mahiyyətcə elə dayanıqlılığın proses halına gəlməsinin kafi şərti kimi çıxış edə bilər.

Dördüncüsü, inkişafın dayanıqlılığı problemi industrial təsərrüfat tipinin böhranı və

postindustrializmə keçidin ilkin başlanğıcında meydana çıxan problemdir. Bu anlamda, industrial dövrün dövləti və bazarı ilə postindustrial dövrün dövləti və bazarı eyniyyətdə deyildirlər. Dayanıqlılıq fenomeni cəmiyyətin tipi ilə determinə olunandır. Yəni dövlət → bazar cütlüyündə müdaxilənin universal formaları ola bilməz və yoxdur. Həmçinin hər bir ölkənin özünə xas, milli spesifika ilə funksional bağlılıqda olan müdaxilə strategiyası vardır. Bu aspektdən dünya təcrübəsi elə bir rol oynamır. Konkret şəkildə ifadə etsək, söhbət, ümumiyyətlə, Dövlət → bazar ikiliyindən yox, milli dövlət → milli bazar cütlüyündən gedir. Milliliyin dominant mövqeyə çıxışı sözügedən müdaxilənin də «milli» yük daşıdığını şərtləndirir.

**İstifadə edilmiş ədəbiyyat / *References***


Abbasov.Dzh. (1998). Ekonomicheskaya i sotsial'naya geografiya Azerbaydzhanskoy Respubliki. Baku: BGU, s.124

Cilpin R. (1990). The political economy of international reeations. Princeton.1987

Coleman J. (1990). Foundation of Social Theory. Cambridge;

DOON (2012). Prevrashchaya v real'nost' budushcheye, kotorogo my dobivayem dlya vsekh. Doklad. OON.. (Elektronnyy resurs). s.2.

Edracheva.Ye.L., Libman.A.M. (2005). Problemy globalizatsii i integratsii mezhdunarodnogo biznesa i ikh vliyaniye na rossiyskuyu ekonomiku. Marketing v Rossii i za rubezhom, №7.

Emil E.; Feser Eduard J. (1999). Understanding Local Economic Development/ Putqers University.

Fei J.; Ranis G.A.. (1981). Theory of Economic Development//American Economic Review., Vol.51.

Gelbreyt Dzh.. (1979). Ekonomicheskiye teorii i tseli obshchestva. M.;, s.362. 1966

GPAR (2005). Gosudarstvennaya programma Azerbaydzhanskoy Respubliki po razvitiyu toplivno – energeticheskogo kompleksa (2000-2015). Baku; «Zakon». 14 fevralya 2005g. 84

ISEW (1999). Growing Pains? An index of Sustainable Economic Welfare for the United Kingdom, 1950-1990 – The New Economics Foundation, p.11

Kashirin.V.V. (2019). Osoboye mneniye dlya vyzovov postkrizisnogo ekonomicheskogo razvitiya Rossii: rynok, gosudarstvo, naseleniye – sbalansirovannoye vzaimodeystviye// Mezhd. Nauchnaya konferentsiya. M.

Khudokomov A.G. (2009). Ekonomicheskaya teoriya: noveyshchiye techeniya Zapada. M.

Kochetov.A.G. (1999). Geoekonomika. M.

Kondrat'yev N.D. (2004). Suzdal'skiye pis'ma.M.: Ekonomika, 879 s.

Kravchenko.I.I. (1982). Ekologicheskaya problema v sovremennykh teoriyakh obshchestvennogo razvitiya. M.

Kuznets S. (1966). Six Lectures on Economic Growth. London: Routledge.

Myurdal'.G. (1972). Sovremennyye problemy «Tret'yego mira». M., Progress.

Skorobogatov. A.S. (2008) Perspektivy postindustrial'nogo obshchestva v Rosii v svete iyerarkhichnosti natsional'nykh i regional'nykh ekonomik: / Ekon. Vestnik Rost. Gosudarstvennogo universtiteta. - Том 9. №2.

Skorodumova O.B. (2007). Otechestvennyye podkhody k interiretatsii informatsionnogo oyushchestva: postindustrialistkaya, sinergeticheskaya i postmodernistskaya paradigmy. M..

Tolstykh V.I. (2000). Globalizatsiya v sotsiokul'turnom izmenenii. Trudy fonda Gorbachova. T.7., M. str.220

Waters M. (1995). Globalization. London: Routledge.

# Феномен устойчивости развития: теоретическая интерпретация

**Вугар Байрамов**
Ведущий научный сотрудник,
доктор философских наук, доцент,
Институт экономики НАНА, Азербайджан.
E-mail: bayramov.vuqar@gmail.com

**Резюме.** В статье рассматривается проблема устойчивого развития, ее трактовка с различных аспектов и концепций устойчивого развития. Таким образом, проблема устойчивого развития - одна из важнейших проблем. При этом одноразовых решений этой проблемы не существует. Иными словами, проблема как неотъемлемый атрибут процесса экономического развития имеет чрезвычайно сложную структуру. Прежде всего, следует отметить, что термин «устойчивое развитие» (в Азербайджане часто используется термин «устойчивый», а иногда оба термина используются в одной последовательности) - это перевод с иностранного языка. Однако в иностранном языке (английском, французском, немецком) значение этого выражения имеет более широкое значение. Например, английское слово «устойчивый» означает как устойчивый, так и жизнеспособный, экологически рациональный, отвечающий будущим потребностям, а «развитие» означает не только развитие, но также рост, улучшение, эволюция, производство и так далее. содержит. Такая же ситуация и с другими иностранными языками (немецкий, французский). Перевод выражения на азербайджанский язык чрезвычайно узок. Даже до такой степени, что в какой-то момент возникает ощущение, что в этом стиле выражения есть логическое противоречие. Действительно, «устойчивость» понимается в смысле равновесия, но «развитие» как процесс означает «дисбаланс» - дисбаланс. Однако неадекватность стиля выражения не следует понимать в смысле противоречия концепций. Так, 40 лет назад экологи рекомендовали применять понятие «устойчивость» к экономике в целом, то есть понимать ее как «устойчивое состояние экономики» (в балансе с экосистемами). Эта идея стала более популярной в последующие периоды, и были предложены конкретные подходы к устойчивому развитию экосистем и экологическому развитию.
**Ключевые слова:** экономическое развитие, устойчивость, устойчивое развитие, концепция, экономический подход, социальный подход, глобальная социоприродная среда, безопасность.